İKİNCİ BASQI




# Mufidul mustefid fi kufri tariki tavhid

# TÖVHİDİ TƏRK EDƏNİN HÖKMÜ BARƏSİNDƏ FAYDALI SÖZ

**Müəllif:**

**Şeyxulislam Mücəddid Alləmə**

**Muhəmməd ibn Əbdülvəhab**

**TƏRCÜMƏ EDƏN:**

**Əbu Əbdurrahmən**

# Ön söz

Həmd yalnız aləmlərin Rəbbi olan Allaha aiddir. Ona həmd edir, Ondan yardım və bağışlanma diləyir və Ona tövbə edirik. Nəfislərimizin şərindən və əməllərimizin pisliklərindən Allaha sığınırıq. Allah kimi hidayət edərsə onu heç kimsə azdıra bilməz. Və kimi azdırarsa onu heç kimsə hidayət edə bilməz. Biz şahidlik edirik ki, Allahdan başqa ibadətə layiq və haqqı çatan məbud yoxdur, O bu ilahlığında təkdir və onun bu ilahlığında heç bir şəriki yoxdur və şahidlik edirik ki, Muhəmməd ﷺ Onun qulu və elçisidir.

Allah onu hidayət və haqq olan dinlə göndərmişdir ki, bütün dinləri üstələsin (yox etsin) və buna Allah özü şahid olaraq yetər. Allahın salamı və salatı Muhəmmədə və onun ailəsinə, əshabına və onlara gözəl şəkildə tabe olanlara olsun.

Və sonra bilmək lazımdır ki, günümüzdə müsəlmanlar arasında ən çox ixtilafa səbəb olan məsələlərdən biri də "təkfir"-yəni müəyyən bir şəxsə küfür hökmünü verməklə bağlı olan məsələdir. Bu məsələdə bəziləri hədlərini aşaraq cahilliyi mütləq şəkildə inkar etmişlər. Digərləri isə hər bir halda şirk və ya küfr etmiş kəsin cahil olduğunu bildirərək, cahilliyə mütləq şəkildə üzür görmüşlər. Belələrinin halı daha da şiddətlidir. Çünki, bu kəslərə görə küfr sadəcə etiqadla olur. Şübhəsiz ki, bu onların sələfiləri olan ğulat Murcialarıın rəyidir. Ancaq əhli sünnətə görə müsəlman dili ilə söylədiyi bir sözə etiqad etmədiyi halda belə kafir ola bilər. Həmçinin bu küfr, qəlbinin etiqadı və əməllərin icrası ilə də baş verə bilər.

Buna görə də bu gün tövhidi bu ümmətin qəlbində bərqərar etmək və şirkin nə dərəcədə dəhşətli bir günah olduğunu anlatmaq lazımdır. Və həmçinin də biz tövhid kəliməsinin tələblərindən olan "dostluq və düşmənlik" əqidəsini bərpa etməyin vacibliyini anlamalıyıq. Hətta Allahın bizə ədavəti və düşmənçiliyi vacib bildiyi kəslərə islam hökmü verərək, onları bizim düşmənlərimiz olduqları halda özümüzə qardaşlar hesab edib, Allahın dininə müxalif olmayaq.

Bu məsələ olduqca vacib olduğu kimi də, olduqca təhlükəlidir. Çünki bir insana müsəlman olduğu halda, kafir hökmü vermək necə təhlükəli məsələdirsə, digər bir kafirə də müsəlman hökmü vermək bir o qədər təhlükəli məsələdir. Biz bu iki hökmün Allahın hökmləri olduğunu unutmamalıyıq.

Bu səbəbdən də biz bu məsələni elim əhlinə qaytarmağı özümüzə vacib bildik. Bunun bizim üçün iki səbəbdən faydası vardır.

1. Bu məsələnin həqiqətinin üzə çıxması. Çünki, tərcümə etdiyimiz kitabın müəllifi, tövhid və şirk məsələlərində ümmətin ən böyük alimlərindən olan Muhəmməd ibn Əbdulvəhabdır. Məs bu məsələləri onun fəhmi ilə öyrəncəyimizdə böyük fayda vardır. Şeyx bir çox böyük alimlərin və ümmətin ən səhih məzhəbləri olan dörd məzhəbin və İbn Teymiyyə, İbn Qəyyum kimi ictihad dərəcəsinə çatmış alimlərin fəhmləri ilə bu məsələni açıqlamış, ifrat və təfrit arasında olan haqq yolu bəyan etmişdir.
2. Bir çox müasir bidətçilərin şeyx Muhəmməd ibn Əbdülvəhabın guya cahilliyi mütləq şəkildə üzür görməsini və qəbirlərə ibadət edənlərin müsəlman olmalarına etiqad etdiyini iddia edirlər. Və bu sözləri nəinki şeyxə hətta, İbn Teymiyyəyə və İbn Qəyyuma (Allah onların hamısına rəhm etsin) nisbət edirlər. Bu kəslərin halı, elə şeyxin dövründə yaşayan tövhid düşmənlərinin halları ilə eynidir.

Məs bu səbəbdən də şeyx bu cür islam düşmənlərinin əqidələrini ifşa etmək üçün bu kitabı yazmışdır. Və burada Allaha şərik qoşaraq tövhidi tərk edən müşriklərin təkfirində tərəddüdə və şəkkə yer olmayacağını bəyan etmişdir.

## **Risalənin yazılma səbəbi**.

Şeyxin(Allah ona rəhm etsin) bu risaləni yazmasına səbəb, Hərmələ sakinlərinin islam dinindən çıxmaları və mürtəd olmaları barədə verilən fətvaya, bəzi özünü elmə nisbət edən adamların bu fətvaya müxalif olmaları olmuşdur. Bu səbəbdən də şeyxdən bu məsələyə aydınlıq gəlməsi və müsəlmanlara şübhə salanlara qarşı qətiyyətli cavab verməsi üçün bir kitab yazması istənilmişdir.

Hərmələ əhli, tövhid əhlinə dil uzadaraq onlara qarşı malları dilləri və əlləri ilə cihad etmişlər. Və bu işdə digərlərinə yardım etmişlər. Bu da onların mürtəd olmalarına səbəb olmuşdur. Və öz adətlərinə münasib olaraq ğulat Murcialar ayağa qalxaraq insanların qəlblərinə müxtəlif şübhələr salaraq, onları təşvişə salmaq istəmişlər. Və müsəlmanı nə edirsə etsin, müəyyən olaraq təkfir olunmayacağını bildirmişlər. Çünki , O lə iləhə illə Allah deyir və özünü islama nisbət edir. Baxmayaraq ki, onların bu əməllərinin şirk və küfr olduğunu da etiqad edirdilər, yalnız

onların təkfirinə müxtəlif üzürlər gətirərək şeyxi Xaricilikdə ittiham edirdilər. Bu cür insanların içərisində şeyxin qardaşı olan **Süleyman ibn Əbdülvəhabı** da misal çəkmək olar. Onun bu barədə şeyxə məktubu da var. Bəzi elim əhli bu risalənin məs ona rəddiyə olduğunu da bildirmişlər. Belə ki, şeyxin risalədəki bəzi sözləri də buna şahiddir.

Bu və bunun kimi şübhələrə cavab olaraq Şeyx (Allah ona rəhm etsin), öz qələmi ilə onların əqidələrinin batil olduğunu bəyan etmişdir. Şeyx, Allahın və onun Rəsulunun ﷺ nəzdində, küfr və ya şirk işləyən müəyyən insanın hökmünün nə olduğunu bəyan etmişdir. Və bildirmişdir ki, Rəsulullahın ﷺ və onun əshabının və onlardan sonra gələn imamların əqidələrinə görə, Allahla yanaşı ilah tutan, Allahın düşmənlərini özünə dost tutan, şəriətdən bir şeyə istehza edən, quranın hökümlərindən bir hökmü inkar edən, Allahın şəriətindən bircə şeyi belə dəyişdirən (hakim), quran və sünnətdən bircə hökmü inkar edən adam, haramlığı açıq aydın bilinən bir şeyi halal edən hər bir kəsin müəyyən olaraq təkfir olunması vacib bir məsələdir. Və şeyxin bu risaləsi, mütləq şəkildə cahilliyi üzür görənlərin, bu batil və heç bir dəlilə söykənməyən fikirdən dönmələri üçün gözəl bir vasitə və hüccətdir.

Bu və bunun kimi məsələləri əhatə etdiyi üçün, bu kitabın bu gün bu ümmət üçün faydalı bir kitab olduğunu düşündük. Və həmçinin də haqqı axtaranlar üçün, əsil hüccət olduğuna etiqad edərək onu Allahın izni ilə sizə təqdim edirik***. Əziz muvahid qardaşım və bacım, Uca olan Allaha and içirəm ki, bu kitab da, bir vergül belə faydasız deyil. Onun üçün bu kitabı adi bir kitab kimi oxuma.*** Uca Allahdan bu əməlimizin onun rizası üçün olmasını bizlərə nəsib etməsini və bütün müsəlman qardaş və bacılarımıza faydalı olmasını istəyirik. Rəbbimiz bütün müsəlmanları sabit etsin.

Həmd və şükür yalnız aləmlərin Rəbbi olan Allahadır. Onun Rəsulu Muhəmmədə və onun əshabına və əhli beytinə və qiyamətə qədər onlara gözəl şəkildə tabe olanlara Allahın salatı və salamı olsun.

Şeyxdən müsəlmanlara fayda verəcək bir kitab yazması tələb olundu və şeyx, (Allah ondan razı olsun) bu kitabı yazdı.

**Rəhman və Rəhimli olan Allahın adı ilə .**

**Ona sığınırıq və Ona təvəkkül edirik.**

İmam Müslim(Allah ondan razı olsun)öz səhihində, Amr ibn Abbas Əs Suləmidən (Allah ondan razı olsun) rəvayət edərək buyurur; Mən islamdan öncə insanlar heç bir din üzərində olmadıqlarını, onların zəlalətdə olduqlarını zənn edirdim və onların bütlərə ibadət etdiklərini düşünürdüm. Daha sonra Məkkədə bir kişinin, yeni bir dinə dəvət etdiyini eşitdim. Elə o an öz miniyimə mindim və onun yanına gəldim. Onu ﷺ öz qövmünün təqiblərinə məruz qalan vəziyyətdə gördüm. Yanına gəldim :

-Sən kimsən deyə soruşdum?

-Mən Allahın nəbisiyəm deyərək cavab verdi.

-Nəbi nə deməkdir deyə soruşdum?

-Məni Allah göndərib deyə cavab verdi

-Allah səni nə üçün göndərib deyə soruşdum?

-Allah məni qohumluq əlaqələrini qorumaqla, bütləri qırmaq və Allaha ibadət edib ona heç bir şeyi şərik qoşmamaqla göndərib, deyə cavab verdi.

-Səninlə bu işdə bərabər kimlər var diyə soruşdum ?

- Bu gün mənimlə bu işdə həm qullar, həmdə azad insanlar vardır. Əbubəkir və Bilal (Allah onlardan razı olsun) mənimlədir deyə cavab verdi.

-Məndə sənə tabe ola bilərəmmi? diyə sordum.

-Doğrusu sən bu gün bunu bacarmazsan: Məgər sən mənim və insanlarin bugünkü hallarını (fərqimizi) görmürsənmi?

Ən yaxşısı sən öz əhlinə dön. Nə zaman mənim öz dəvətimi izhar etdiyimi görsən, onda mənə qoşularsan.

Mən əhlimə geri döndüm və Rəsulullahﷺ öz dəvətini izhar edənədək orada qaldım. Mədinədən gələn bir qrup kişidən, Rəsulullahın ﷺ Mədinəyə hicrət etməsini eşitdim. Onların yanlarına gələrək soruşdum.

-O Mədinəyə gələn kişi nə edir ?

-İnsanlar ona tərəf axnaşırlar. Qövmü onu öldürmək istəyib, lakin bacarmayıblar deyə cavab verdilər.

Bir qədər sonra məndə Mədinəyə gəldim. Rəsulullahın ﷺ yanına gələrək, Ondan soruşdum :

-Ya Rəsulullahﷺ ,məni xatırladınmı?

-Bəli xatırladım, sən Məkkədəki mənim yanima gələn adamsan, diyə cavab verdi .

-Ya Rəsulullah ﷺ Allahın sənə öyrətdiyi və mənim də cahil qaldığım o şeyləri mənə öyrət. Mənə namaz barəsində xəbər ver dedim.

-Sübh namazını qıl, sonra günəş çıxıb yüksələnə qədər, namaz qılma. Həqiqətən də günəş şeytanın buynuzlarının arasından çıxır və bu an ona kafirlər səcdə edirlər. Sonra yenə namaz qıl, həqiqətən də o namazda iştirak edənlər və o namaza şahidlik edənlər var. Sonra kölgə bir nizə uzunluğuna çatanda namazı dayandır, həqiqətən də o an cəhənnəm əridilir. Sonra yenə namaz, günəş batdığı zaman namazı dayandır. Çünki günəş şeytanın buynuzlarının arasında batır və o an kafirlər ona səcdə edirlər. Diyə cavab verdi.

Sonra səhabə (Allah ondan razı olsun) hədisi sonuna qədər rəvayət edir .

Əbul Abbas(Ibn Teymiyyə Allah ona rəhm etsin)buyurur: Peyğəmbər ﷺ namazı günəşin çıxdığı və batdığı vaxtlarda qılmağı qadağan etmişdir. Bu qadağanın səbəbi, həmən vaxtlarda, kafirlərin günəşə səcdə etmələridir.

İnsanların çoxunun Günəşin çıxması və batmasını, şeytanın buynuzlarının arasında baş verməsindən və bu an kafirlərin günəşə səcdə etmələrindən, xəbərləri olmasa da, Rəsulullah ﷺ o vaxt ibadəti qadağan etmişdir. Bu qadağanın səbəbi isə, müsəlmanları kafirlərə bənzəməkdən, çəkindirməkdir. Hər kəs bilir ki möminlər, öz səcdələrini yalnız Allaha edirlər. Lakin Rəsulullahﷺ kafirlərlə, müsəlmanların,

eyni vaxtda səcdə etmələrini və onların ibadət şəklinin biri-birinə bənzəməsini görərək, bu ibadəti qadağan etmişdir.

Və həmçinin namaz qılınarkən, hər hansi bir ağacın və ya başqa (Allahdan qeyri ibadət olunan) əşyaların sağ tərəfdə qalması da, bu səbəbdən vacibdir. Allaha, o əşyalarla üz-üzə duraraq ibadət etməyin qadağan olması da, bu hikmətə dayanmaqdadır. Həmçinin də, Rəsulullah ﷺ hər hansı bir insanla üzbəüz duraraq Allaha ibadət edilməsini də qadağan etmişdir. Çünki bu əməl Allahdan qeyrisinə ibadət edənlərin əməllərinə bənzəyir. Şeyxin kəlamının sonu.....

Öz nəfsini hesaba çəkən hər bir müsəlman, bu hədisdəki ibrətləri düşünməlidir. Və bilməlidir ki Allah, öz Nəbilərinin və onlara tabe olan möminlərin xəbərlərini bizlərə bildirir ki, biz onların halları ilə öz halımızı müqayisə edərək ibrət alaq. Və həmçinin kafir və münafiqlərin də hallarını bizə xəbər verir ki, onlardan və onlara bənzəyənlərdən də uzaq olaq.

Bu hədisdə ki, böyük faydalardan biri də; Bu cahil ərəb kisinin, öz qəlbindəki xeyrə və dinə olan sevgisi səbəbindən Məkkədə ki bir şəxsin, insanların üzərində olduqları dindən, müxalif bir dinə dəvət etdiyini eşitdiyi zaman, səbir edə bilmədi və öz miniyinə minərək, Rəsulullahın gətirdiyi olan o elmi öyrənmək üçün, Onun yanına gəldi. Bu insanın halı, Allahın bu ayəsini necə gözəl izah edir:

﴿وَلَوْ عَلِمَ ٱللَّهُ فِيهِمْ خَيْرًا﴾

**”Əgər Allah onlarda bir xeyir bilsəydi”** yəni dini öyrənməyə həris olmalarını bilsəydi;

﴿لَّأَسْمَعَهُمْ﴾

**“onda mütləq onlara (öz dinini) eşitdirərdi.”**

Yəni mütləq onları başa düşən (fəhmli) edərdi. Və bu ayə dəlildir ki, günümüzdəki insanların əksəriyyətinin cahil və fəhmsiz olmalarının səbəbi, onların qəlblərində, dini öyrənməyə hərisliyin olmamasıdır. Bu səbəbdən də, Allahın onlara (dinini) eşitdirməməsi ədalətlidir.

Həmçinin bu hədisdən bilinir ki, insanın alçalmasının və rəzil hala düşməsinin əsas səbəbi, dinini öyrənməyə həris olmamasıdır. Əgər O cahil insan, (hədisdəki səhabə) haqqı öyrənmək üçüm və bu tələb olunan məqsədə çatması üçün o qədər yolu gəldisə, bu gün özlərini peyğəmbərlərin davamçıları adlandıran o kəslərə, bu cahilliklərinə görə nə üzr ola bilər ki?

Hələ bir üstəlik onlara dindən az və ya çox nələrsə də, artıq çatmışdır. Bununla yanaşı onları öyrədən kəslərin ətraflarında mövcud olmasına baxmayaraq, haqqı öyrənmək üçün, başlarını belə qaldırmaması, onlara hansı üzrü gərəkdirə bilər ki?

Əgər Onlar hər hansı bir məclislərdə (elim məclislərində) olsalar, və ya (kimlərdənsə haqqı) eşidsələr belə sadəcə Allahın bu ayəsində dediyi kimi özlərini aparərlar;

﴿مَا يَأْتِيهِم مِّن ذِكْرٍ مِّن رَّبِّهِم مُّحْدَثٍ إِلَّا اسْتَمَعُوهُ وَهُمْ يَلْعَبُونَ ۝٢ لَاهِيَةً قُلُوبُهُمْ﴾

**“Rəbləri tərəfindən onlara nə yeni öyüd nəsihət gəldisə, onu eşidən kimi əyləncəyə və məsqərəyə çevirdilər. Bu onların qəlblərinin (haqqa qarşı) laqeyid qalmasından belədir”**

Həmçinin bu hədisdə olan böyük ibrətlərdəndir ki ;

Nə zaman ki O şəxs, Rəsulullahdan ﷺ “məni Allah göndərib” kəlməsini eşitdi, həmən nə üçün göndərildiyinin səbəbini soruşdu. Yəni dinin məqsədini öyrəndi.(Yəni o özü getdi və öyrəndi)

Həmçinin faydalardan:

İlahi risalənin əsas məqsədinin heç bir şəriki olmayan Allahı, ibadətdə təkləşdirmək və saxta məbudları qırmaq və məhv etməkdir. Və bilmək lazımdır ki, məbudları qırmaq və məhv etmək üçün mütləq**, şiddətli ədavət və qınından çıxarılmış qılınc olarsa mümkün olar: Elə ona görə bu risalənin (dinin) məqsədi barədə diqqətlə düşün.** (Ədavət və düşmənçilik olmazsa din də olmaz)

Həmçinin faydalardan;

Bədəvi ərəb tövhidin məqsədini başa düşmüşdü və anladı ki, əzəmətli və misli olmayan böyük bir işdir və başa düşdü ki, bu yol qəriblərin yoludur. Elə bu səbəbdən də, Rəsulullaha ﷺ tabe olanların kimlər olduğunu soruşdu.

Rəsulullah ﷺ qullar və azad insanlar diyə cavab verdi. Və bildirdi ki, bunlardan başqa bütün alimlər, başçılar və onlara tabe olan avamlar belə bu işdə Rəsulullaha ﷺ müxalifdirlər, sadəcə və sadəcə o iki nəfərdən başqa. Məhz bu açıq aydın dəlildir ki, haqq sayca azlıqda olanların yanında olur. Batil isə bütün yer üzünə yayılır.

Əl Fudeyl bin İyad (Allah ona rəhm etsin) buyurur:

*"Haqqa tabe olanların azlığı səni təşvişə salmasın. Batilə qurşanıb həlak olanların sayları da səni qürurlandırmasın."*

Və ondan da yaxşını isə Allahu təala buyurur:

﴿وَلَقَدْ صَدَّقَ عَلَيْهِمْ إِبْلِيسُ ظَنَّهُۥ فَٱتَّبَعُوهُ إِلَّا فَرِيقًا مِّنَ ٱلْمُؤْمِنِينَ ٢٠﴾.

**"İblisin onlar barəsindəki zənni doğru çıxdı. Bir dəstə mömindən başqa, qalanları onun toruna düşdülər."**

Imam Buxarı və Müslimin səhihində rəvayət etdikləri hədisdə hər min nəfərin, doqquz yüz doxsan doqquzu cəhənnəmə və yalnız bir nəfərin cənnətə düşəcəyini Rəsulullahﷺ söylədiyi zaman hədisi eşidən səhabələr ağlamağa başladılar. Sonra Allah Rəsuluﷺ buyurdu:

***"Həqiqətən də elə bir peyğəmbərlik risaləsi olmadı ki, cahilliyə (müşriklərinin) üzərinə göndərilmiş olmasın və onlardan camaatlar ora (cəhənnəmə) atılacaqdır. Əgər dolmazsa, cəhənnəm münafiqlərlə doldurulacaq".***

Imam Tirmizi (Allah ona rəhm etsin) bu hədisə həsən səhihdir demişdir.

Əgər insan bu hədis barəsində düşünərsə, islamın necə başlamasını və Rəsulullaha ﷺ tabe olanların kimlər olduğunu başa düşər. Və sonra bütün bunlara Peyğəmbərin ﷺ imam Müslimin səhihindəki ***"Islam qərib başladı və başladığı kimi elə qəribdə dönəcək"*** hədisini də əlavə edərsə və **Allah da, bunu dərk etməyi ona müvəffəq edərsə**, **bu məsələnin incəliyi ona aydın olar və Fironun davamçılarının gətirdiyi bu şübhə ondan düşər:**

﴿فَمَا بَالُ ٱلْقُرُونِ ٱلْأُولَىٰ﴾

**“Bəs onda əvvəlkilərin aqibəti nə olacaq.”**

Həmçinin qureyşin gətirdiyi bu hüccətin də batil olduğunu anlayar:

﴿مَا سَمِعۡنَا بِهَٰذَا فِي ٱلۡمِلَّةِ ٱلۡأٓخِرَةِ﴾

**“biz bunu (bu əgidəni) axirincilardan başqa (sizdən əvvəl) heç kimdən eşitməmişik”.**

Əbul Abbas (Ibn Teymiyyə)*“İqtida sirat əlmustəqim”* adlı kitabında Uca Allahın bu ayəsi barədə buyurur:

﴿وَمَآ أُهِلَّ بِهِۦ لِغَيۡرِ ٱللَّهِ﴾

**“ Və nələr ki, Allahdan qeyrisi üçün kəsilir.”**

Ayənin zahirindən görsənir ki, Allahdan qeyrisi üçün kəsilən haramdır, istər onun üzərində Allahın ismi zikr olunsun və ya zikr olunmasın bu hökmü dəyişdirməz. Bunun haram olması, Məsihin və başqalarının adını zikr edilərək kəsilmiş ətlərin haram olmasından daha aydin və zahirdir.

Necə ki, Allaha yaxinlaşmaq uçun, Onun adını zikr edərək kəsdiklərimizin, sadəcə yemək üçün kəsdiklərimizdən, daha savablı olduğu hər kəsə məlumdur. Həqiqətən də Allaha namazla orucla, ibadət etmək, bir işə başlayarkən Bismillah deməkdən daha əzəmətli ibadətdir.

Və Allahdan qeyrisinə ibadət etmək, ondan qeyrisindən yardım istəməkdən daha əzəmətli küfrdür.{1}Əgər bir kəs Allaha yaxınlaşmaq niyyəti ilə ondan başqası üçün qurban kəsərsə, Allahın adı ilə kəssə belə

mütləq o ət haram olar. Necə ki, bu gün ümmətdən olan bir qrup münafiqlər, bu əməli edirlər. O mürtədlərin kəsdikləri hər bir halda haram sayılsa da, bu əsas iki səbəbdən haramdir.{2}

Və buda Məkkədə və başqa yerlərdə hal-hazırda cinlər üçün kəsilənlərlə eynindir. İbn Teymiyyənin kəlamının sonu .....

Bu gün Allahın dinin düşmənləri Şeyxə (İbn Teymiyyəyə) nisbət edərək bildirdilər ki, guya şeyx müəyyən şəxsi təkfir etməyib.

Allah səni müvəffəq etsin. Bax gör Şeyxulislam (Allah ona rəhm etsin) bu ümmətdən olan və Allahdan qeyrisinə qurban kəsənləri necə təkfir edir. Və açıq aydın bildirir ki, o münafiqlər bu əməlləri ilə mürtəd olublar. Şübhəsiz ki, bu da müəyyən şəxs üçün deyilib. Çünki kəsilmiş ətin haram olması yalnız və yalnız müəyyən şəxs üçün deyilir.

Yuxarıda zikr etdiyimiz elə həmin kitabında, Şeyxulislam (Allah ona rəhm etsin) buyurur: "Cahilliyə dönəmində ibadət olunan üç ən böyük tağutlar; lat, manat və uzza idi. Və onların üçü də ərəblərin ərazilərində idi:

-O ki qaldı lata onun Taif əhlindən olan saleh bir kişi olduğu zikr olunur. Həccə gedənlər üçün halva bişirib paylayardı. O, öldükdən sonra qəbrinin üzərində türbə tikdilər .

-O ki qaldı uzzaya, Məkkə əhlinə məxsus olub, Arafaya yaxın bir məkanda yerləşən ağac idi və onun ətrafında həm qurban kəsilir, həm də dualar edilirdi.

-O ki qaldı manata, o Mədinə əhlinə məxsus idi və Mədinənin Qadid adlanan bölgənin kənarında yerləşirdi.

------------------------------------------------------------------------------------------------

**1.Çünki ibadət etmək uluhiyyət tövhidinə aiddir və məhz bu tövhid tələb olunandır.**

**2.Şeyx səbəbləri burada zikr etməsə də, İbn Teymiyyə(Allah ona rəhm etsin)iki səbəbi belə izah edir:**

**1. Allahdan qeyrisi üçün kəsdiklərinin şəriətdə haram olması.**

**2.Onların mürtəd olması və mürtədlərin kəsdikləri şəriətdə haram olması.**

**Bax Fəthul Məcid kitabı "Tövhidin fəziləti" babına . Həmçinin "iqtida sirat əl müstəqim" kitabında 259 səhifə bax.**

Məhz bu səbəblərdən kim ərəb müşriklərinin hallarını və onların o bütlərə (saleh insanların sürətlərinə) ibadətlərinin hansı şəkildə baş verməsini bilərsə, onda mütləq Allahın qadağan etdiyi şirk və onun növləri, o kəs üçün aydın olar. Və əgər Quranın mənasını başa düşmək istəyərsə, onda Rəsulullahın ﷺ zamanındakı ərəblərin hallarına baxsın. Həmçinin də Əl Əzraqi və başqa alimlərin Məkkədə bas verən hadisələr barədə dedikləri sözlərə nəzər salsın.

**O ZAMAN MÜŞRİKLRİN AĞACLARI VAR İDİ VƏ ONLAR O AĞACA SİLAHLARINI ASARDILAR VƏ ONU "ZƏTUL ƏNVAT" DEYƏ ADLANDIRAR-DILAR VƏ BƏZİ İNSANLAR;**

-Ya Rəsulullah bizə də onların ağacları kimi, "zatul ənvat" düzəlt, dedilər.

- Rəsulullah; ﷺ "Allahu əkbər. And olsun ki, mütləq siz özünüzdən əvvəlkilərin yoluna uyacaqsınız" deyə buyurdu. Və sadəcə ağaca silahlarını asaraq, onun ətrafında oturmağı kafirlərə bənzəməsinlər deyə inkar etdi.[1]

Əgər Rəsulullah ﷺ mücərrəd bənzəməyə görə belə şiddətlə inkar etmişdisə, bəs görəsən onda bundan daha şiddətli olan şirkin özünü necə edərdi?

Sonra eyni adlı kitabinda şeyxulislam İbn Teymiyyə (Allah ona rəhm etsin) buyurur: "Və bunun kimi Dəməşqdə olan məkanların birin də, **"Əl məscidi"(Ələm məscidi) adlanan bir məscid də, əl şəklində olan bir şey var idi, onun Əli ibn Əbu Talibin (Allah ondan razı olsun) əlinin timsalı olduğunu iddia edirdilər**, hətta Allah o **bütü** dağıtdı. Belə məkanlardan ərəb yarımadasında çoxdur."

Sonra şeyx Rəsulullahın ﷺ qəbrinin yanında namaz qılmağın qadağan olması barədəki çoxsaylı hədisləri zikr edərək, bu qadağaya səbəb kimi isə: Bu əməllərin şirkə götürən qapılardan olmasını Şafi, Maliki və Həmbəli məzhəbinin imamlarından rəvayət edir.

---

1.**Allah rəsulu sadəcə müşriklərə bənzəməyi inkar etmişdir. Və bu da günümüzdə sahibələri şirkdə ittiham edənlərə Şeyxin fəhmi ilə gözəl cavabdır. Bu səbəbdən də şeyx "şübhələrin kəşfi" kitabında bu dəlili müşriklərin şübhəsi kimi qələmə vermişdir.**

Allahu təala buyurur:

﴿وَقَالُوا لَا تَذَرُنَّ آلِهَتَكُمْ وَلَا تَذَرُنَّ وَدًّا وَلَا سُوَاعًا وَلَا يَغُوثَ وَيَعُوقَ وَنَسْرًا

**“Onlar dedilər; ilahlarınız olan vəddi, suadı, yağusu, yəuqu və nasrı əsla tərk etməyin.”**

Sələflərdən Ibn Abbas və başqaları ayənin bu hissəsində zikir olunan isimlərin, Nuhun ﷺ qövmündə yaşamış salehlərin adları olduğunu bildirmişlər. O vaxt ki, onlar öldülər, insanlar onların qəbirlərinin yaninda əyləşib onları yad edirdilər. Daha sona bu əməl onların timsallarını düzəltməyə və ən sonunda isə,( tövhid elminin unudulması ilə) o timsallara ibadət olunması ilə nəticələndi. Bunu imam Buxari, İbn Cərir və başqaları (Allah onlara rəhm etsin) öz təfsirlərində qeyd etmişlər.

Və bütün bu əməllərin nəticəsi ilə baş vermiş şirklər səbəbindən, Rəsulullahﷺ peyğəmbərlərin qəbirləri üzərində məscidlər tikənləri və o məkanları ibadətgahlara çevirənləri lənətləmişdir. Və məlumdur ki, rəsulların qəbirlərinin torpağı nəcis deyildir. O zaman demək ki, qadağanın səbəbi, mücərrəd bənzəməyi inkar etmək məqsədini güdür. Və Rəsulullahﷺ öz nəfsi üçün; *“mənim qəbrimi ibadət olunan məkana çevirməyin diyə əmir etmişdir.”*

Bil ki, bunun qadağan olunması, günəşin çıxması və batması anında olan ibadətin qadağan səbəbi ilə eynidir. Və buradaki məqsəd, o anda namaz qılan və ya dua edən müsəlmanın, bu əməlləri yalnız Allah üçün etməsinə baxmayaraq, kafirlər ilə eyni vaxtda və eyni şəkildə (səcdə) ibadət edərək, bu vaxtda olunan ibadətlərin, kafirlərin ibadətinə bənzəməsindən qorxduğu üçün, qadağa qoyulmuşdur. Bu qadağa nə vaxtsa Allaha günəş vasitəsi ilə ibadət edilməsinin qarşısını almaq üçündür tətbiq edilmişdir. Çünki bu iki ibadət növü artıq baş verməkdədir. Həqiqətən də insanlardan bəziləri duaların bəzi növlərini günəşə və ulduzlara sərf etməkdədirlər və bu ən dəhşətli şirklərdəndir. Əvvəlkilərin və sonrakıların azmasına məhz bu əməllər səbəb olmuşdur. Hətta özünü islama nisbət edənlərdən belə, bu şirkə düşənlər vardır.

Və Abu Məşər Əlbəlxi, Səbit ibn Qurra kimi bəzi məşhur insanlar və onların mislində olanlar bu barədə kitablar yazmışlar və müşriklərin məzhəbinə müvafiq olaraq şirkə düşmüş, cibtə və tağutlara iman gətirmişlər. Hətta onlar özlərini Allahın kitabına nisbət edirlər, necə ki bu barədə Allah buyurur:

﴿أَلَمْ تَرَ إِلَى ٱلَّذِينَ أُوتُوا۟ نَصِيبًا مِّنَ ٱلْكِتَٰبِ يُؤْمِنُونَ بِٱلْجِبْتِ وَٱلطَّٰغُوتِ﴾

**”Kitabdan nəsibi olanların cibtə və tağuta iman gətirdiklərini gördünmü?”** Şeyxin kəlamının sonu........

**Bax Allah sənə rəhm etsin, bax gör Allah qəlblərini haqdan azdırdığı insanlar,** necə də bu imama nisbət edərək, guya şeyxulislamın müəyyən şəxsi təkfir etmədiyini bildirirlər.

Bu necə ola bilər ki, hansı ki Şeyxulislam, Şafi məzhəbinin böyük alimlərindən olan Fəxrəddin Razi və böyük yazarlardan olan Əbu Məşərin və başqalarının isimlərini zikr edərək onlarin kafir və mürtəd olaraq islamdan çıxmalarını zikr etmişdir.

Və kəlam əhlinə rəd verərkən, şeyx Fəxri Razinin kitablarında yazdığı şeyləri bildirərək, beləsinin müsəlmanların icması ilə mürtəd olduğunu söyləyir. İnşallah şeyxin bu barədə ki sözlərini, daha sonra zikr edəcəyik.

Və həmçinin şeyxülislamın, müşriklərin lat və uzzaya etdikləri əməllərinin bu gün, Dəməşqdə və başqa yerlərdə olunan əməllər ilə eyni olması barədəki sölərini və “zətul ənvat” barədəki sözlərini də diqqətlə düşün. Bütün bunlar mücərrəd bənzətməyə görə deyilmiş sözlərdir. Bəs onda şeyx bundan daha şiddətli olan şirkin eynisini edənlər barədə nə dəyərdi?

Görəsən qəlblərində xəstəlik olanlar bundan sonra şeyxin daha hansı sözündən tutacaqlar?

Mən Şeyxulislamın (Allah ona rəhm etsin) o sözünü zikir edəcəyəm ki, hansı ki qəlbləri haqdan azanlar bu sözləri öz azğınlıqlarına dəlil kimi gətirirlər:

**“Mən insanların içində, müəyyən bir şəxsə peyğəmbərlik risaləsi çatmamış kafirlik, bidətçilik, fasiqlik və asilik nisbət olunmasını ən çox qadağan edənlərdənəm.**

**Əgər risalə çatdıqdan sonra ona müxalif olarsa, onda beləlari kafir və ya fasiq və ya günahkar sayılirlar.”**

Şeyxulislamın kəlamının sonu........

Bu şəkildə gələn müəyyən şəxsin təkfirində Şeyxulislamın (Allah ondan razi olsun) bu kəlamı ilə bütün məsələlərdə bizdə razıyıq.

Bəli əgər bir şəxs hər hansı bir məsələdə anlaşılmazlığa düsərsə, O şəxsə həmin anlaşılmazlığı izah etməyənə qədər biz onu təkfir etmərik. Və buradakı maneə hüccətdən qabaq təkfirin qadağası maneəsidir.

Yox əgər hüccət çatıbsa onda O şəxsin, halına uyğun kafirliyinə, fasiqliyinə və ya asiliyinə hökm verərik.[1]

-----------------------------------------------------------------------------------------------

**1.Bu yerdə bəzi özlərini sələfə nisbət edərək alimlərin, “ hüccət çatmamış təkfir etmərik” kimi sözlərini öz batil məzhəblərinə dəlil gətirənlərin, bu cür şübhələrini ifşa edək. Əhli sünnə alimləri, aşağıda zikir olunan insanlara dünya hökmlərində heç bir üzrün olmadığı barəsində icma etmələrini zikr edək;**

***“Öyrənmək və soruşmaq imkanı olan kəslərin, həmçinin müsəlmanların yaşadıqları yerlərdə yaşayanlara, dində tövhid və şirk kimi, içki, zina, faiz və donuz ətinin yeyilməməsi kimi hər kəsin bilməsi zəruri olan zahiri məsələlərdə, quranın çatması ilə dünya hökmlərində heç bir üzrün olmamağı barədə, əhli sünnətin alimlərini icma etmişlər. ”***

**Indi isə bu qaydanı öz kitablarında zikr edən alimlərin adlarını zikr edək.**

**1- Şeyxulislam ibn Teymiyyə: “Əl-Fətava” (22/16)**

**2- İmam İbn Qəyyum: “Tariku’l-hicrəteyn”17-ci təbəqənin şərhi (s.412)**

**3- Muhəmməd bin Əhməd əs-Səmərqəndi əl-Hənəfi: “Mizanu’l-Usul” (1/171)**

**4- Müfəssir imam Bəydavi: “Et-Təfsir” (1/47)**

**5- İbnu’l-Ləhhəm əl-Hənbəli: “el-Qavaid və’l-fəvaid əl-usuliyyə” (s.58)**

**6- Əl-Mukri olaraq bilinən Muhəmməd b. Əhməd əl-Kuraşi ət-Tilmisani əl-Maliki: “Əl-Kavaid” (2/412)**

**7- Şeyxulislam Muhəmməd b. Əbdülvəhab: “Əd-Durarus-səniyyə” (8/16)**

**8- Süleyman b. Səhmən ən-Nəcdi: “İrşədu’t-Talip” (s.11)**

**9- Əl-Kərəfi əl-Məliki: “Əl-Furuk” (2/150)**

**10- İbn Rəcəp əl-Hənbəlî “Əl-Qavaid” (s.343)**

**11- Muhəmməd Rəşid Rıza: “Haşiyətun alə məcmuurrəsail ən-nəcdiyyə” (s.520)**

**12- Şeyx Abduləziz bin Bəz: “Fətavəş-şeyx” (2/528)**

**13- Şeyx Salih bin Həmid: “Risalətu rəf’u’l-hərəc” (s.220)**

**14- Şeyx Abdulqadir əl-Udəh: “ət-Təşriu’l-cinai” (1/43)**

Həmçinin Şeyxulislam (Allah ondan razı olsun) açıq aydın bildirmişdir ki, onun sözləri zahiri məsələlərə aid deyildir[1].Və kəlam əhlinə rəddiyəsində şeyx bildirmişdir;

"Bəzi kəlam əhlinin imamları bir çox sözlərinə görə dindən çıxmışlar. Əgər bu kəlmələr şəriətdəki gizli məsələlər[2] barəsində deyilsəydi onda, o kəlmənin sahiblərinə, zəlalətdə olanlar və azanlar deyilərdi. Çünki, onlara (bu əməlləri tərk etməyənin təkfir olunması) hüccəti çatmayıb. **Lakin onlar bu sözləri elə məsələlərdə işlədiblər ki, (yəni zahiri məsələlərdə) bu məsələləri müsəlmanların avamıda, alimidə bilməkdədir. Çünki Allah Rəsulullahı ﷺ bu məsələlər ilə göndərib və Rəsulullah ﷺ buna müxalif olanı təkfir edib. Məsələn heç bir şəriki olmayan Allaha ibadət etmək. Şəkk yoxdur ki, bu Allahdan qeyri məbudlara, mələklərə, Nəbilərə, salehlərə, övliyalara və başqalarına ibadətin qadağan olması məsələsidır.**

**Bu islamın ən zahirdə olan şuarlarındandır. Beş vaxt namazın qılınması və bu işin əzəmətli olması da, fuhuş işlərin, faizin və içkinin haram olması da, bu məsələlər kimi ən aydın şuarlardandır. Sonra görürsən ki, onların (kəlam əhlinin) başçıları bunları (bu şirk əməlləri) ediblər və mürtəd olublar**.

Daha dəhşətlisi də odur ki, onlardan Fəxrəddin Razi kimiləri müşriklərin dinləri barədə kitablar yazıblar və bununla da müsəlmanların icması ilə açıq aydın dindən çıxıblar." (kafir olublar) Şeyxulislamın kəlamının sonu....

**Allahın düşmənlərinin şübhələrinin dəf olunması üçün, necədə incə və aydın açıqlamalarımız barədə dərindən düşün. Lakin Allah azdırmaq istədiyi kimsə barəsində, sən artıq Allah nəzdində heçnə edə bilməzsən.**

---

1.**Zahiri məsələlər deyildikdə hər kəsin biləcəyi, Allahdan başqasına dua etməmək, qurban kəsməmək, nəzir, təvəkkül kimi tövhidə aid olan məsələlər və bəzi haramlardan, içkinin, faizin, zinanın və s., haramlar nəzərdə tutulur ki, bunları hətta xristianlar və yəhudilər belə dinimizdə haram olduğunu bilirlər. Şeyx bunları bu kitabda izah etdiyi üçün əlavə sənədə ehtiyac duymadıq.**

**2.Gizli məsələlər dedikdə isə ad və sifətlər tövhidi, bəzi qədərə aid olan cüzlər aid edilə bilər hansı ki, bunun kimi gizli məsələlər də İbn Həcər, Qurtubi, İmam Nəvəvi və s, alimlərə belə gizli qalaraq onların bu məsələni yanlış anlamlarına səbəb olmuşdur.**

Və biz Allaha etiqad etdiyimiz din (əqidə) olaraq və Allahdan bizi bu etiqadımızda sabit etməsini istəyərək, yəqinliklə etiqad edərək deyirik ki, İbn Teymiyyə belə əgər bu məsələdə xəta edərsə ki, müsəlman ona bəyan olduqdan sonra Allaha şərik qoşarsa, və müsəlmanda bunu (Allaha şərik qoşmağı) muvahidə rəva görərsə və ya elə hesab edərsə ki o (Allaha şərik qoşan) haqdadır və ya bundan başqa açıq-aydın küfrü izhar edərsə hansı ki, Allah da, onun Rəsulu ﷺ da, ümmətin alimləri də onun küfür olduğunu bəyan ediblər. Mən Allahdan və onun Rəsulundan ﷺ gələnlərə əsaslanaraq iman edirəm ki, hətta bu xəta edən insan kimliyindən asılı olmayaraq təkfir (kafir olur) olunur.. Bu necə ola bilər ki, Allaha həmd olsun, biz bircə dənə də olsun alimdən bu əqidəyə müxalif olanını tanımırıq. Sadəcə Fironçuların hüccətinə baş vuranlardan başqa ; (onlar belə şübhə gətirərlər)

﴿فَمَا بَالُ ٱلْقُرُونِ ٱلْأُولَىٰ﴾

**“Bəs onda əvvəlkilərin aqibəti necə olacaq.”**

Və həmçinin qureyşin hüccəti

﴿مَا سَمِعْنَا بِهَٰذَا فِى ٱلْمِلَّةِ ٱلْءَاخِرَةِ﴾

**“Biz bunu axırıncılardan (müsəlmanlardan) başqa heç kimdən eşitməmişik”**.

Bu dəlillərə sığınanlardan başqası müxalif olmaz.

Həmçinin Şeyxulislam (Allah ona rəhm etsin) özünün “Ər Risələtu Saniyyə” adlı kitabında, xaricilərin dindən çıxmalarını və Rəsulullahınﷺ onlarla vuruşmağı əmr etdiyini nəql edərək buyurur: “Necə ki Rəsulullahın ﷺ zamanında yaşamış insanlar özlərinin əzəmətli ibadətlərinə baxmayaraq, Rəsulullaha ﷺ müxalif olduqları üçün dindən çıxmışdırlar, eləcə də bizim zamanımızda da islama nisbət olunanlar dindən çixa bilərlər və bu bəzi səbəblərdən ola bilər.

**- Səbəblərdən,** Allahu təalanın dinində həddini aşmaq**,** hansı ki Allah bunu edənlər barədə buyurur:

﴿يَٰٓأَهۡلَ ٱلۡكِتَٰبِ لَا تَغۡلُواْ فِي دِينِكُمۡ غَيۡرَ ٱلۡحَقِّ﴾

**“Ey kitab əhli, haqsız yerə dininizdə həddinizi aşmayın” (Qadınlar171)**

**Necə ki,** Əli ibn Əbu Talib ğulat rafiziləri (şiələri) Kindanın qapıları önündə çuxur qazdıraraq, yandırmağı əmr etdi və bütün səhabələr bunda ona müvafiq oldular. Yalnız İbn Abbas onların qılıncla öldürülməsi yolunu seçdi və bu əksər alimlərin rəyidir. Bu tarixdə bilinən məşhur bir hadisədir.

**Həmçinin** səbəblərdən insanların, bəzi şeyxlərə, Əli ibn Əbu Talibə və həmçinin Məryəm oğlu İsaya ﷺ qarşı hədlərini aşmalarını qeyd etmək olar. Hər kəs ki, Nəbilərə və yaxud salehlərə qarşı hədlərini aşarlar, onlar həmin saleh insanlara ilahlıqdan bir sifət vermiş sayılırlar. Və görürsən ki dua edərkən, belə deyirlər:

“Ey seyyidim filankəs mənə kömək ol, və ya mənə ruzi ver, və ya məni çətinlikdən çıxar və yaxud mən sənin himayəndəyəm və s. Bunun kimi sözlər işlədən hər kəs şirkdə və zəlalətdədir və tövbəyə dəvət edilir. Əgər tövbə edərsə nə gözəl, əks təqdirdə öldürülür.

Həqiqətən də Allah, Rəsulları və Nəbiləri kitablarla göndərmişdir ki, insanlar yalnız və yalnız ona ibadət etsinlər və ona ibadətdə heç bir şeyi şərik qoşmasınlar və onunla yanaşı da heç bir ilahdan tutunmasınlar. Və o kəslər ki, Allahla yanaşı, Məsihə və ya mələklərə və ya bütləri (ibadət edərək) onları ilahlar edirlər və etiqad edirlər ki onlar məxluqatı idarə edərək, yağışı yağdırırlar, buğdanı cücərdirlər, onların qəbir sahiblərinə və ya onların sürətlərinə ibadətlərində ki etiqadları, Rəsulullahın ﷺ dövründə yaşayan müşriklərin etiqadı ilə eynidir;

﴿مَا نَعۡبُدُهُمۡ إِلَّا لِيُقَرِّبُونَآ إِلَى ٱللَّهِ زُلۡفَىٰٓ﴾

**”Biz onlara bizi Allaha yaxınlaşdırsınlar diyə qulluq edirik.”**

﴿وَيَقُولُونَ هَٰٓؤُلَآءِ شُفَعَٰٓؤُنَا عِندَ ٱللَّهِ﴾

**”Onlar bizim Allah nəzdindəki şəfaətçilərimizdir.”**

Allah öz Rəsulunu ﷺ duanın hər cür növünün, istər ibadət, istərsə də yardım diləmək olsun, yalnız ona yönəldilməsini və ondan başqa heç kimə yönəlməməsini bəyan etmək üçün göndərmişdir. Uca Allahu buyurur:

﴿قُلِ ٱدۡعُواْ ٱلَّذِينَ زَعَمۡتُم مِّن دُونِهِۦ فَلَا يَمۡلِكُونَ كَشۡفَ ٱلضُّرِّ عَنكُمۡ وَلَا تَحۡوِيلًا ٥٦﴾

**“De ki, Allahdan qeyri (yardımçılar olaraq) zənn etdiklərinizi çağırın. Onlar nəinki sizlərdən zərəri dəf etməyə, heç onu sizdən yayındırmağa belə qadir deyillər”**

Sonra Şeyxulislam buyurur:

“Sələfdən bir tayfa Məsihə, Üzeyirə və mələklərə dua edən qövmlər olduğunu bildirmişlər.” Və sonra şeyxulislam ayələri zikr edərək deyir: “Allaha heç bir şərik qoşmadan ibadət etmək islam dinin əsasıdır. Məhz bu da Rəsulların və Kitabların gətirmiş olduğu tövhidin mənasıdır. Allahu təalə buyurur:

﴿وَلَقَدۡ بَعَثۡنَا فِي كُلِّ أُمَّةٖ رَّسُولًا أَنِ ٱعۡبُدُواْ ٱللَّهَ وَٱجۡتَنِبُواْ ٱلطَّٰغُوتَ﴾

**“Biz artıq bütün ümmətlərə, Allaha ibadət edin və tağutdan çəkinin diyə rəsullar göndərmişik.”**

﴿وَمَآ أَرۡسَلۡنَا مِن قَبۡلِكَ مِن رَّسُولٍ إِلَّا نُوحِيٓ إِلَيۡهِ أَنَّهُۥ لَآ إِلَٰهَ إِلَّآ أَنَا۠ فَٱعۡبُدُونِ ٢٥﴾

**“Səndən əvvəl elə bir rəsul gəlməyib ki, biz ona! Məndən başqa ilah yoxdur və mənə ibadət edin diyə vəhyi etmiş olmayaq.”**

Rəsulullah ﷺ tövhidin haqqını vermiş (kamilliyinə çatmış) və onu ümmətinə öyrətmişdir. Hətta o vaxt ki, bir kişi Ona Allah və Sən istədikdən sonra dedi, Rəsulullah ﷺ qəzəblənərək;

***“Sən məni Allaha taymı tutursan? Əksinə de ki, tək olan Allah istərsə.”***

Deyə cavab verdi. Sonra Allahdan qeyrisinə and içməyi qadağan edərək buyurdu:

***“Kim Allahdan qeyrisinə and içərsə, artıq küfr edər və ya şirk edər’’***(Əbu Davud(3215).

Ölüm anında isə Rəsulullah ﷺ ;

***“Allah yəhudi və xristianlara lənət etsin. Onlar öz nəbilərinin qəbirlərinin üzərində məscidlər tikdilər’’***(Səhih Buxari 1330)

***“Allahım mənim qəbrimi ibadət olunan məkana çevirmə.”***

Digər rəvayətdə isə;

***“Mənim qəbrimi ziyarət olunan məkana çevirməyin! Evlərinizi qəbiristanlığa çevirməyin!***[1]

***Harada olursanız olun mənə salavat deyin!***

***Həqiqətən də sizin salavatlarınız mənə çatdıracaqlar.”***[2]

Deyərək buyurmuşdur.

Və bu səbəbdən ümmət imamları ittifaq ediblər ki, qəbirlərin üzərində məscidlər tikmək və orada namaz qılmaq şəriətdə qadağandır. Bu ona görədir ki, bütlərə ibadət səbəblərinin ən böyüyü, məhz qəbirlərə təzim edilməsi ilə bağlıdırdır. Buna görə də Alimlər ittifaq ediblər ki, kim Peyğəmbərin ﷺ qəbrinin yaninda ona salam verərkən əlini ora sürtərsə və ya onun evinin daşından öpərsə harama girər. Çünki bu şeylər Kəbəyə aiddir və Yaradanın evi ilə yaradılanın evi, bir-birilərinə bənzəməz .

---

**[1] Səhih Müslim ‘’Qəbirlərin üzərində məscidlər tikməyin qadağan olması babı. ’’**

**[2] Hədisi Həsən ibn Əli (Allah onlardan razı olsun) rəvayət etmişdir və Şeyx Albani “Cəmiu fi səhih” kitabında səhih hədis kimi zikr etmişdir. 7233.**

Bütün bunlar tövhidi tətbiq etmək üçündür. Çünki tövhid dinin əsası və başıdır. Allahu təalə yalnız onunla birlikdə edilən əməli qəbul edir və yalnız onun əhlini bağışlayır. Önü tərk edəni isə heç vaxt bağışlamaycağına vəd vermişdir.

Allah təalə buyurur :

﴿إِنَّ اللَّهَ لَا يَغْفِرُ أَن يُشْرَكَ بِهِۦ وَيَغْفِرُ مَا دُونَ ذَٰلِكَ لِمَن يَشَآءُ﴾

**“Allah, ona şərik qoşanı heç vaxt bağışlamaz. Bundan başqasını (aşağı olanı) isə, istədiyinə bağışlayar ”**

Məs bu səbəbdəndir ki, tövhid kəlməsi ən əzəmətli və ən fəzilətli kəlimədir. Quranda da kürsü ayəsi, bu səbəbdən ən əzəmətli ayədir:

﴿اللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ الْحَيُّ الْقَيُّومُ﴾

***“Allah, ondan başqa ilah yoxdur . O, diri və həyat bəxş edəndir”***

Rəsulullah ﷺ buyurur:

«من كان اخر كلامه لا إله إلا الله دخل الجنة»

***“Kimin son sözü lə iləhə illə Allah olarsa cənnətə girər ”***

İlah odur ki, ona ibadət edilərək qəlblərdə ucaldılsın. Və həmçinin ondan yardım istənilsin və ona ümid edilərək, ondan qorxulsun və bununla yanaşı təzim edilərək müqəddəs hesab olunsun.

İbn Teymiyyənin kəlamının sonu ......

Şeyxin kəlamının əvvəlinə və sonuna bax. Nəbilərə və övliyalara dua edənlər barədəki dediyi sözlər barədə duşun. O kəslər ki, ya Allahin

vəlisi kömək ol deyirlər; ***“öncə tövbəyə çağırılır və tövbə etməzlərsə öldürülürlər”***.

Bütün bunlar müəyyən şəxs üçün deyilməyibsə, bəs kimin üçün deyilib? Allahım bunu anlamayanların hallarına düşməkdən sənə sığınırıq .

Həmçinin lat, uzza və manat barədə dediyi sözləri və onların ardınca dediyi sözlər barəsində düşünsən Allahın izni ilə, sənə hər şey bəlli olacaq.

İbn Qəyyum (Allah ona rəhm etsin) “Əl Mənəzilin” şərh edərkən, tövbə babında buyurur:

“O ki qaldı şirkə, onun iki növü vardır. Böyük şirk və kiçik şirk.

**Böyük şirk** sahibi, yalnız və yalnız dünyada ikən bu əməlindən Allaha tövbə edərsə bağışlanar. Onlar o kəslərdir ki, Allahdan başqalarını ona tay tutaraq Allahı sevər kimi onları sevərlər. Əksinə onlar öz ilahlarını Allahdan daha çox sevərlər. Hətta, bir kəs onların şeyxlərini naqisləşdirdikdə o şəxsə, Aləmlərin Rəbbini naqistləşdirən kəsdən daha çox buğz edərlər.[1] Biz bunun kimi və bundan daha betər halların, gözümüzün önündə baş verməsinin şahidi olmuşuq.

Və bəzən də görürsən ki, öz məbudunu (şeyxini) dilində zikr edir oturanda, duranda və sıxıntı keçirdikdə də, bunlari edir. Şeyxi isə bu halı inkar etmir. Məhz xəbis və saxta bütlərə ibadət edənlərin halı da belədir.

Və bu şeylər onların qəlblərində yer tutaraq, bütün zamanın müşriklərinin mirasına çevrilmiş və ilahları müxtəlif olsada da, onlara eyni şəkildə ibadət ilə, ibadət etmişlər. Bu cür kəslərdən bəziləri əşyaları və bəziləri də bəşəri ilahlaşdırmışlar.

---

**1.Yəni onlar, öz şeyxlərini naqistləşdirən bir muvahidə, Allaha şərik qoşaraq ibadət edən və ya ona dil uzadan bir müşrikdən daha çox nifrət və ədavət bəsləyərlər**

Şanı uca olan Allah onların əcdadlarının sözlərini misal çəkərək buyurur;

...

﴿وَٱلَّذِينَ ٱتَّخَذُوا۟ مِن دُونِهِۦٓ أَوْلِيَآءَ مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَآ إِلَى ٱللَّهِ زُلْفَىٰٓ﴾

**“Özlərinə Allahdan qeyri övliyalar tutanlar, biz onlara ibadət etmirik, biz bu ibadətlərimizi, (onlar) bizləri Allaha yaxınlaşdırsınlar deyə edirik.”**

Və bu Allahdan başqa özünə övliya tutaraq onu Allaha yaxınlaşdırdığını zənn edənin halıdır. **Bütün bunlardan (şirklərdən) uzaq olan necə də izzətlidir. Və necə də ucadır o şəxs ki, bu şirki inkar edənə (yəni muvahidə) qarşı ədavət aparmır.**

Məs həmən o müşriklərin və onların əcdadlarının qəlblərində ki, öz ilahlarının, onlar üçün Allah nəzdində şəfaətçi olacaqlarıni etiqad etmələri, əsil şirkin özüdür. Uca Allah artıq bunun şirk olduğunu öz kitabinda onların bu əməllərini rədd edərək, batil olduğunu bəyan etmişdir. Və şəfaətin bütünlüklə özünə aid olduğunu bildirmişdir.

Sonra İbn ƏIqəyyum (Allah ona rəhm etsin) bu böyük şirkin barəsində uzun uzadı danışmışdır....

Lakin sən düşün: Şeyxin sözləri barədə diqqətlə düşün;

**“Necə də izzətlidir bunlardan xilas olan və bunları (yəni şirki) inkar edən şəxsə qarşı ədavət aparmayan adam”** əgər düşünsən, Allahsızların buraxdıqları şübhələrinin batilliyi sənə bəyan olar. Və Şeyxin ikinci fəsildəki kəlamının, onların gətirdikləri fikirlərə uyğun olduğunu zənn edənlərin batil bir şübhədən başqa bir şeyin üzərində olmadıqları, sənə bəyan olacaq. Və mən inşallah bunların hamsını zikr edəcəyəm ki, hətta haqq öz yerini tutsun. Sonra birinci fəslin sonunda, yəni böyük şirk barədə olan fəsildə, Səba surəsində olan ki bu ayəni zikr edir.

**“De, çağırın Allahdan qeyri ilah zənn etdiklərinizi.”**

Hətta ayənin bu yerinə qədər ki,

**“O şəxs üçünkü ona izin veriləcək”**.

Daha sonra bu ayə barədə danışaraq bildirir;

**“Bu ona görədir ki, O şirkin nə olduğunu bilmir və quranın şirki inkar etdiyini və ondan üz döndərdiyini anlamadığı üçün, şirkə düşür, onu iqrar edir. Və həmçinində, cahiliyyə dönəmində ki insanların halları ilə eyni halda olduğundan xəbərsiz olduğu halda, islamını itirir və onun nəzdində, məruf münkərə, münkərə mərufa, bidət sünnətə, sünnət isə bidətə çevrilir.** Və təmiz imanı olanı və tövhidə əməl edəni, Rəsulullahın ﷺ sünnəsinə tabe olanı, havaları və bidətləri tərk edən bir muvahidi təkfir edir (xəvaric deyir). Bəsirəti və qəlbi diri olanlar isə bunları görməkdədir. Allahım bu hala düşməkdən sənə sığınırıq.

O ki qaldı kiçik şirkə: Riyakarlıq, Allahdan qeyrisinə and içmək və həmçinin bəzi sözlər: “bu Allahdan və səndən oldu”, “Allahdan və səndən başqa heç kimim yoxdur”, “Allaha və sənə təvəkkül edirəm”, “əgər sən olmasaydın belə olmazdı” kimi kəlmələri bura aid etmək olar.

Lakin bütün bunları söyləyənin qəstindən və halından asılı olaraq, böyük şirkə də düşə bilər. Sonra İbn Qəyyum (Allah ona rəhm etsin) böyük və kiçik şirki zikr etdikdən sonra buyurur:

“Həmçinin şeyxlərə səcdə etmək də şirkin növlərindəndir. Şeyxə tövbə etmək də bura aiddir. Allahdan başqasına nəzir etmək, Allahdan qeyrisinə təvəkkül etmək, Allahdan qeyrisi üçün əməl etmək, Allahdan qeyrisinə ümid, zəlillik və təzim etmək, ondan başqasından ruzi tələb etmək, nemətləri Allahdan başqasına nisbət etmək də, şirkin növlərindəndir.

Həmçinin ölülərdən ehtiyaclarını istəmək, onlardan yardım istəmək, onlara ümid edərək yönəlmək, bütün bunlar aləmlərdə baş verən şirkin əslidir. Həqiqətən də ölmüş insanın əməlləri kəsilmişdir və O, özünə nə bir xeyir verməyə, nə də bir şəri dəf etməyə qadir deyildir, hətta istənilənin kim olmasından asılı olmayaraq. Və O, ölmüş kəsdən Allah yanında şəfaətçi olmasını istəyir. Və bu hala düşməsi onun, (müşrikin) Allahın nəzdində şəfaəti tələb edənin və şəfaət istənilənin, kim olduğundan **cahil olması** səbəbindəndir. Çünki Uca Allahu öz nəzdində izni olmadan, heç kəsin şəfaətini qəbul etmir. Və Allahu təala şəfaət etməsinə səbəb kimi, kimlərdənsə istənilməsini şərt qoymamışdır. O,

yalnız və yalnız, səbəb kimi tövhidin kamilliyini şərt qoymuşdur. Belə olduğu təqdirdə **o müşrik**[1]qəbirin yanına gəlir və şəfaət izninə qadağan olunan səbəblərdən tutunur. Çünki, meyidin özünün onun üçün dua edilməsinə ehtiyacı vardir.

-------------------------------------------------------------------------------------------

**[1] Diqqət et şeyx İbn Qəyyum (Allah ona rəhm etsin) cahil müsəlman demir. Müşrik ismini verir. Hətta o haqqı bilmədiyi, özünün haqlı olduğunu zənn etdiyi halda və ona hüccət çatmadığı halda belə, bu şəxsin müşrik olduğunu bildirir. Bu məqamda Alimlərin hüccəti qaldırmadan öncə isim vermələrinin və hüccəti qaldırdıqdan sonra həm isim, həm də hököm vermələri barədəki, əhli sünnətin icma etdikləri qızıl qaydanı zikr etməyi lazım bildim. Çünki, bu barədə özünü "Alim" sayan, bəzi cahillərin bu məsələni dərk etmədən danışmaları, müvahidlər arasında çaxnaşmaya və parçalanmağa səbəb olmuşdur.**

**Əsrimizin böyük alimlərindən sayılan İbrahim əli şeyx, İbn Bəz, Albanı və Şinqiti (Allah onlara rəhm etsin) kimi böyük alimlərdən elim alan və Muhəmməd ibn Əbdülvəhabın nəslindən olan, Salih bin Əbdüləziz Əli şeyx, (AllahOnu qorusun) bu qayda barəsində buyurur:**

**"Şəriətdə hökmlər dünya və axirət hökmləri diyə iki qismə bölünür. Dünya hökmləri sadəcə zahirə görə verilir. Axirət hökmləri isə zahirə və batinə (qəlbinin etiqadına) görə verilir. Qullara vacib olan isə sadəcə zahirə görə hököm etmləridir. Çünki, gizlilərdə olanları yalnız Rəbbimiz bilir. Əgər bir tayfa və ya müəyyən bir şəxs küfr izhar edərsə, ondan maneələri və şərtləri qaldırdıqdan sonra, alim onu müəyyən olaraq təkfir edir. Və kimdə, şirk və ya küfr izhar olarsa, istər o bu əməlinə görə üzrlü olsun və yaxud üzrlü olmasın; yəni ona hüccət çatsın və ya çatmasın. O insan zahirdə (bizim üçün) kafir və müşrikdir. Deməк ki, kim şirk izhar edərsə o müşrikdir. Çünki, hər bir doğulmuş şəxs fitrət üzərində doğulur və Allah öz tövhidinin dəlillərini ağıllarda və şuurlarda bərqərar etdiyi üçün, bu dəlillər şirk və küfr izhar edən şəxsə, dünya hökmlərində heç bir üzrün olamaması üçün kifayət edir. Yəni bizim mükəlləf olduğumuz dünya hökmlərinin, müşrikin etdiyi şirklə bir başa əlaqəsi vardır. O baxımdan ki, o şəxs üçün bağışlanma diləməmək, onun kəsdiyinin yeməmək, cənazə qılmamaq, nigaha girməmək və s, kimi dünya hökmlərinə aiddir. Ancaq, alimlərə (qazilərə) aid olan məsələlərə gəldikdə; onun canının və malının halal edilməsi, onunla vuruşmaq və s bütün bunlar sadəcə hüccəti qaldırdıqdan sonra baş verir. Çünki sadə insanlarla, qazinin, o şəxs üçün əlaqəli olduğu hökmləri və məsələləri, (bizim o müşriklə əlaqəli olan məsələlərdən) fərqlidir.**

**Demək ki, belə olduğu təqdirdə bizdə, batinlə və zahirlə əlaqəli bəzi hökmlər meydana çıxır. Bu da O şəxsə hüccət iqamə edilməsi və ya onunla**

